# Yoxsulluq küfrə aparır

Allaha həqiqətən də qul olmaq istəyən Ona yaxşı inanar. Hər bir işini Ona təslim edər. O qul, bilər ki, ruzi cəhətdən Allah kifayətdir. Kəfildir. O ruziləndirir. Yenə həmin qul qənaət gətirmişdir ki, özünə gəlib çatan yaxşı bir iş, ilahi iradədən və əmrdən xəbərsiz deyildir. Həyatda olan hər bir müvəqqəti hal isə ilahi qədərin təyinidir. Xüsusilə bu ilahi vədə qopmaz bağlılığı vardır: "Bir kimsə Allahın əmrlərinə bağlı olar və ondan qorxarsa ona çətin yollar asanlaşar. Bilmədiyi yerdən ruzi qapıları açılar. Özünə tam təvəkkül edənə Allah yetər". İman sahibi daima bu cür ayələri oxuyar və mənasına görə ruhu rahatlıq tapar. Yəni, mənasını bilib ruhununa rahatlıq gələr. Qəlbi fərahlanar. Bolluq dövründə bunu belə bilər. Vaxt gələr, bir hikmətə uyğun olaraq imtahan vaxtı gələr və dərhal sızlanmağa başlar, ağlar, fəryad edərsə bu halı onun tam bir iman sahibi olmadığını göstərər. O kimsə bilməz ki, ilahi qədər ağlamaqla, sızlamaqla keyfiyyətini dəyişməz. O zavallının bu acıqlı halı Peyğəmbərimizin (s.ə.s): "Yoxsulluq vaxt gələr ki, küfrə yaxınlaşdırar" hədisinin mənasına girər.

İman sahibi hansı fəlakət olursa olsun, sarsılmaz və mənəviyyatını pozmaz. Yaxşı inanmışdır ki, hər şey müvəqqətidir. Dünya müvəqqəti olduğu kimi, onun imtahan dövrü də müvəqqətidir. Yenə qəlbini Allaha bağlayan bilər ki, Allah istədiyi vaxt həmin kimsədən bəlanı qaldıra bilər. Bu Allahın lütfüdür. Bir gün gələr özünün də imtahan dövrü yekunlaşar, afiyət və bolluğa qovuşar. Daima şükr edər, həmd edər. Səna edər və bu halı Allaha qovuşana qədər davam edər.

Bu hallar göstərir ki, ilahi imtahanlar iki tərəfdən təcəlli edər. Biri iman sahibinin imanını artırmaq üçün, digəri isə zəif imanlının mənəviyyatını pozmaq üçün. əgər o zəif imanlı güc tapıb dözə bilərsə imanı qüvvətlənər.

Allah bütün qullarına bir çox yöndən bəla verir. Bu bəlalar çoxunun fəlakətinə səbəb olur. Qul, o dövrlərdə Allaha tam bağlanmaz, dayanmadan etiraz edər. Allah təalanı (Allaha sığınırıq) töhmət altına salmaq istəyər, şikayətlənər, söyər, sayar və s... Bu onun əbədi küfrünə səbəb olar və beləcə dünya və axirəti bərbadlaşar. Haqqa qovuşduğu zaman ilahi rəhmətdən hər kəsin nəsibi olar. Amma onun olmaz. Çünki Rəbbi ona daralmışdır. Peyğəmbərimiz (s.ə.s) bu hala belə işarə etmişdir: "Qiyamət günü ən nəsibsiz olan, dünyda yoxsul, axirətdə cəhənnəm əzabına düçar olandır". Bu haldan Allaha sığınırıq. Çünki bu hal fəlakətdir. Peyğəmbərimiz (s.ə.s) bu fağırlıqdan Allaha sığınmışdır.

İkinci şəxsə gəlincə: O, haqqıyla inanmışdır. Allahın birliyinə və Onun edəcəyi hər cür əziyət və cəfaya razıdır. Zahirən cəfa kimi görünən hər halın bir nemət olduğunu yaxşı bilir. Onda tam bir qənaət vardır ki, sevgili qullara qovuşmaq üçün onlar kimi yaşamaq lazımdır. Peyğəmbərlərə varis olmaq üçün onların çəkdiyi kimi cəfalar çəkmək lazımdır. Düşünür: Hansı alim, hasnı fəzilətli, hansı hikmətli, hansı böyük, hansı Allah dostu, hasnı dərviş, hansı bəndə cəfadan, hansı bəy çətinlikdən uzaq qaldı.

Amma, nə olursa olsun, Allaha dayanan hər kəs xilas olar. Ona inanmış olan hər imanlı dar vaxtında daha geniş olar. İlahi kəmənd onun boynundadır. Səbir dağları onları içərisinə almışdır. Çünki imanları qüvvətlidir. Çünki qədərə razıdırlar.

Bu səbr və imandır ki, onu hər an şükür yoluna sövq edər. Hər şeyə müvəffəq olduğu qəza və qədərə boyun əyər. Buna görə də ilahi nrəhmətin ən böyüyünə nail olar.

Gündüzləri onun üçün bir nur qaynağı, gecələr isə bir rəhmət süfrəsi olar. Çölü xoş, içi boşdur. Bu halda davam edər ta ki, Allaha qovuşana qədər. Hidayət bəxş edən Allahdır.

Müəllif: Əbdülqadir Geylani

## Tərcüməçi: Əkrəm Həsənov

29-cu məqalə.
"Vaxt gələr ki, yoxsulluq küfrə yaxınlaşdırar"